**UOT: 63.002**

# İNFORMASİYA TEXNOLOGİYALARININ KƏND TƏSƏRRÜFATINDA TƏTBİQİ

**X.K.ƏHMƏDOVA**
**«Aqromexanika» Elmi Tədqiqat İnstitutu**

*Məqalədə informasiya texnologiyalarının kənd təsərrüfatında tətbiqi mövzusuna toxunulmuşdur. İnformasiya texnologiyaları informasiyanın surətli və asan yolla yayılmasına kömək edir. Bu texnologiyaya əsasən ölkələr, xalqlar arasındakı məsafə azalır və dünya qloballaşır. İstənilən sektorda inkişafın açarı informasiyadır. Əlbəttə ki, bu kənd təsərrüfatına da aiddir.*

***Açar sözlər:*** *informasiya texnologiyaları, e-kənd təsərrüfatı, inkişaf, kompyuter, məhsul, gəlir.*

Yaşadığımız dövr "İnformasiya əsri" və ya "Kompyuter əsri" adlanır. Bu əsr 1970-ci illərdə bir ev kompyuteri ilə başladı. Kompyuter texnologiyasındakı inkişafla, onun istifadəsi laptop, cib telefonu və digər kompyuterləşmiş məhsullarla geniş yayıldı. Artıq informasiya əldə etmək məsələsi hər kəs üçün çox asandır. Müasir avadanlıqların istifadəsinin ən mühüm xarakteristikası odur ki, bunların hamısı kompyuter texnologiyasına əsaslanır. Kompyuter vasitəsilə internetdən əldə olunan məlumatlar, informasiyalar üçün ən mühüm amillərdən biri onların adətən istifadə edilə bilən, praktiki informasiya olmağıdır, yəni faktlar əsasında qurulmağıdır. İnformasiya əldə edənlər üçün məlumatlar dürüst və inandırıcı olmalı, təklifləri özündə birləşdirməli və ən qısa yolunu göstərməlidir.

İnformasiya texnologiyaları informasiyanın surətli və asan yolla yayılmasına kömək edir. Bu texnologiyaya əsasında ölkələr, xalqlar arasındakı məsafə qısalır və dünya qloballaşır. Texnologiya vasitəsi inkişaf etmiş və inkişaf etməkdə olan xalqlara birgə iş görməyə, əməkdaşlıq etməyə imkan verir və onların inkişaf etmiş ölkələrin təcrübələrindən yararlanmağına şərait yaradır.

İnformasiya Texnologiyası və Kənd Təsərrüfatı dedikdə ilk anda yaranan sual odur ki, bu iki fərqli sahənin bir – biri ilə necə əlaqəsi ola bilər? Kənd təsərrüfatı qədim sahə, İT isə insanın ən müasir kəşfi.

İstənilən sektorda inkişafın açarı informasiyadır və bu əlbəttə ki, kənd təsərrüfatı sahəsinə də şamil olunmalıdır. Kənd təsərrüfatı insan yaşayışını təmin edən əsas istehsal sahələrindən biridir. Bu sahə qədim insanın sadə məhsul becərmə üsulları ilə başlamış, nəsildən-nəsilə ötürülmüş və müəyyən zaman ərzində təkmilləşmişdir. Əgər dəqiq və münasib informasiya vaxtında verilərsə, bu kənd təsərrüfatına çox kömək edə bilər. Kənd təsərrüfatı ilə məşğul olan fermerlər internet vasitəsilə istədikləri məlumatı dünyanın istənilən yerində olan mütəxəssislərdən ala bilərlər. Həmçinin öz məhsullarını bazara çıxarmadan internet vasitəsilə sata bilərlər. Bir çox təşkilatlar və müəssisələr kənd təsərrüfatında olan problemlərin həlli ilə bağlı çox sayda dəyərli məlumatlar yerləşdirirlər. Hətta ən ucqar kəndlərdə yaşayan fermer də asanlıqla internet vasitəsilə öz problemlərini həll edə bilər.[2]

Kənd təsərrüfatında informasiya – kommunikasiya texnologiyaları (İKT) e-kənd təsərrüfatı kimi tanınır. Kənd təsərrüfatında İKT-lərin istifadəsinin innovativ yolları inkişaf etdirilir və bir çox problemlərin həlli üçün geniş yollar göstərir.

Kənd təsərrüfatının prioritet istiqamətlərindən biri olan əkinçiliyin elektronlaşdırılmasında e-əkinçilik proqramından istifadə olunur. O, İnformasiya Cəmiyyətinin Ümumdünya Sammitinin bəyannaməsində qəbul edilmiş hərəkət xəttlərindən biridir. Birləşmiş Millətlər Təşkilatının Ərzaq və Kənd Təsərrüfatı Təşkilatı e-kənd təsərrüfatı üzrə İKT tətbiqlərinin fəaliyyəti ilə əlaqədar məsuliyyət daşıyır. Bir çox İKT-lər kənd təsərrüfatı məhsullarının artırılması və gəlirlərinin yüksəlməsi və risklərin azaldılması yolu ilə kənd təsərrüfatı ilə məşğul olan fermerlərə müxtəlif səviyyələrdə mütəmadi kömək göstərirlər.

Misal üçün kənd təsərrüfatında avtomatlaşdırılmış, kompyuterləşdirilmiş sahələrdən biri də heyvanların sağım prosesidir. Avtomatik sağım sistemi insan əməyi olmadan süd sağan sistemlərdən ibarətdir. Sağım prosesinin tam avtomaşlaşdırılması kənd təsərrüfatı robotu və kompleks sürülərin idarə proqramı və ixtisaslaşdırılmış kompyuterlər tərəfindən idarə oluna bilir. Avtomatik sağma sistemi vasitəsilə fermer fermaya və sağıma nəzarət edə bilər.

Fermerlər kompyuter tərəfindən toplanan məlumatları istifadə edərək heyvandarlıq sahəsində idarəçiliyi təkminləşdirə bilərlər. İnəklərin üzərinə quraşdırılan müəyyən ötürücülər vasitəsilə hər bir inək izlənilə bilər. Xəstəlik və ya xəsarət olduqda, fermer bu barədə tez xəbər tuta və dəyəcək ziyanın qarşısını vaxtında ala bilər. Məsələn, Keniyada əkin sahələri-

nə quraşdırılmış qurğular vasitəsilə əkin yerinə heyvan girdikdə tez fermerə müəyyən siqnal göndərilir.

Mobil texnologiyaların kənd təsərrüfatına təsiri də getdikcə geniş yayılmaqdadır. Kənd təsərrüfatında, bağçılıq, heyvandarlıq və kənd təsərrüfatı maşınları üçün bir neçə smartfon proqramlar mövcuddur. Hindistanda Jayalaxmi agrotech Pvt Ltd tərəfindən hazırlanmış və inkişaf etdirilən smartphone mobil proqramları, ən çox istifadə edilən kənd təsərrüfatı proqramlarıdır. Onların mobil proqramları regional dildədir və məlumatı ən sadə şəkildə çatdırmaq üçün nəzərdə tutulmuşdur. Asiyadakı minlərlə fermer bu proqramlarla məlumatlandırılırlar.[2]

Ölkəmizin kənd təsərrüfatında informasiya texnologiyasının tətbiqinin olduqca vacib məsələ olduğunu nəzərə alan Azərbaycan Respublikasının Prezidenti İ.Əliyev cənabları 16 aprel 2014 – ci il tarixli 152 nömrəli Fərman imzalanmışdır. Fərmanda bildirilirdi ki, Kənd Təsərrüfatı Nazirliyi beynəlxalq təcrübəyə əsaslanmaqla "elektron kənd təsərrüfatı "informasiya sisteminin yaradılmasını təmin etməli, aqrar sektorda şəffaflıq yaratmalıdır. "Elektron kənd təsərrüfatı "informasiya sisteminin yaradılması prioritet vəzifə olaraq 2015 – ci ildən Nazirliyin fəaliyyətinin mühüm sahəsini təşkil etməkdədir. Artıq 2018-ci ildə e-xidmət.agro.gov.az saytı yaradılmışdır. Bu sayta aşağıdakı sahələr üzrə xidmətlər daxildir: toxumçuluq fəaliyyəti, damazlıq təsərrüfatları, baytarlıq, fitosanitar, lizinq, kənd təsərrüfatı texnikası üzrə və ödəmə, informativ xidmətləri.[1]

Hal – hazırda ölkəmizdə kənd təsərrüfatının interaktiv regional informasiya sistemi hazırlanır. Yeni interaktiv regional xəritə Azərbaycanın istənilən rayonunda fəaliyyət göstərən fermer barədə ətraflı məlumat əldə etməyə imkan yaradacaq. Bu məlumat platforması Azərbaycanın kənd təsərrüfatının potensialını, gündəlik dinamik inkişafını vizual olaraq izləməyə imkan verəcək. E- kənd təsərrüfatı hökümətin kənd təsərrüfatı strategiyasının və iqtisadiyyatın perspektivli qeyri-neft sektorlarını daha da təkmilləşdirmək istiqamətində irəli sürdüyü geniş siyasətin əsas komponentidir. Bakıda və respublikanın bütün rayonlarında yeni inşa edilmiş və ən müasir avadanlıqlarla təchiz edilmiş inzibati və laboratoriya binaları modern maddi – texniki baza, zəruri informasiya və kommunikasiya texnologiyaları ilə təmin edilmişdir.[1]

Heç şübhəsiz həmin sistemlərin gələcəkdə geniş tətbiqi ölkəmizin kənd təsərrüfatının inkişafında, məhsul bolluğunda və şəffaflığın təmin olunmasında öz müsbət təsirini göstərəcəkdir.

**Nəticə**

İT – nin kənd təsərrüfatında tətbiqinin müsbət cəhətləri aşağıdakılardır:

**1**. Düşünülmüş qərar qəbul etmək – lazımi məlumatlara malik olmaqla iri və kiçik fermerlər kənd təsərrüfatı fəaliyyətləri ilə bağlı daha yaxşı və düzgün qərar qəbul edə bilərlər. İT vasitəsilə fermer öz məhsulunu daha asanlıqla və vaxtında sata bilər. Müxtəlif ölkə və təşkilatlarla təcrübə mübadiləsi də fermerlərə qərar qəbul etməzdən əvvəl müxtəlif faktorlarla tanış olmağa və müqayisə etməyə imkan verir.

**2.** Daha yaxşı planlaşdırmaq – İT vasitəsilə fermerlər bazardakı tələbatı nəzərə almaqla hansı məhsulu nə vaxt əkməyi planlaşdıra bilər, müasir əkinçilik metodologiyaları ilə fermerlər öz məhsullarına daha yaxşı nəzarət edə bilərlər. Nəticədə itkinin qarşısı alına bilər, istehsalı və gəlirlərini artıra bilərlər .

**3.** İT vasitəsilə məlumat əldə etmək – kənd təsərrüfatında ən son nailiyyətlərin öyrənilməsini asanlaşdırır. Məsələn, əgər alimlər payızlıq dənli bitkilərə soyuğa qarşı güclü olmağa kömək etmək üçün üsullar tapır və onu internetdə paylaşırlarsa, dünyanın hər bir yerində olan fermerlər ondan eyni dərəcədə faydalana bilərlər . İT informasiyanı əlçatan edir.

İnformasiya Texnologiyaları ilə bağlı məlumatları fermerlərə çatdırmaq, onlardan səmərəli istifadə edilmə üsullarını öyrətmək üçün təlim kursları təşkil olunmalı və ən son yeniliklər onların nəzərinə çatdırılmalıdır.

**ƏDƏBİYYAT**


1. Azərbaycan Respublikasının Kənd Təsərrüfatı Nazirliyinin rəsmi saytı.
2. https://hubpages.com/food, Role of Information Technology in Agriculture, Geri Mlleff.


**Применение информационных технологий в сельском хозяйстве**


**Х.К.Ахмежлв**



В статье, основное внимание уделяется применению информационных технологий в сельском хозяйстве. Информационные технологии – помогает быстро и легко распространять информацию. Согласно этой технологии, расстояние между народами, странами сокращается и мир становится глобализованным. Ключом к развитию в любом секторе, является наличие информации. Конечно, это относится и к сельскому хозяйству.



***Ключевые слова**: информационные технологии, е-сельское хозяйство, развитие, компьютер, продукт, доход.*

**The Use of İnformation Technology in Agriculture**

**X.K.Ahmedov**

The article deals with the use of information technology in agriculture.It is the technology that is helping to exchange the information in fast and easier way.Due to this technology the distance between or the difference between the nations is reduced and now world is becoming a global village. In any sector information is the key for its development.Agriculture is not exception to it.

***Keywords:*** *İnformation Technology, e-agriculture, development, computer, crop, profit.*

